# ELMİ İŞ

Azərbaycan Respublikası

Aylıq Beynəlxalq Elmi-nəzəri jurnal

***№ 11 (15)***

# НАУЧНАЯ РАБОТА

Азербайджанская Республика

Ежемесячный Международный

Научно-теоретический журнал

***№ 11 (15)***

# *SCIENTICAL WORK*

Azerbaijan Republic Amonth International

Science oritical journal's

***№ 11 (15)***

**Bakı – 2009**

# MÜNDƏRİCAT

ƏDƏBİYYATŞÜNASLIQ

# ƏDƏBİ QƏHRƏMANIN TARİXİ, DON KİXOT OBRAZI

**Jalə QƏNBƏRLI,**
*ADU-nun İspan dili kafedrasının baş müəllimi*

1605-ci ildə Madrid kitabsatanı Fransisko de Robles Servantesin Ağıl dərtası Lamançlı əsilzadə Don Kixot romanının ilk nüsxələrini satmağa başladı. Həmin ilin iyulunda Valensində Don Kixotun birinci hissəsinin artıq beşinci nəşrini satırdılar, 1607-ci ildə İngiltərə və Brussel nəşrləri göstərir ki, bu kitab yalnız İspaniyada deyil, başqa ölkələrdə də böyük şöhrət qazanmışdır.

Roman üzərində işin başlanması tarixini adətən 1600-cü ilə aid edirlər ki, bu vaxt heç də gənc olmayan Servantes Sevilyyanın məhbəsində borc cəzası çəkirdi. Hər halda əsərin birinci nəşrində onun icazə tarixi 1604-cü il 26 sentyabr qeyd olunur. Servantes öz sələflərindən fərqli olaraq cəngavərliyə, xüsusən cəngavərlik idealına birtərəfli münasibətdən uzaq olmuşdur. Don Kixotun kitabxanasının təmizlənməsini əks etdirən məşhur fəsildən göründüyü kimi, müəllif də, onun qəhrəmanları da Qalliyalı Amadis haqqında romana ehtiram edib onu saxlayırlar, Don Kixot özü də dönə-dönə Amadisin xatirəsinə və qəhrəmanlıqlarına istinad edir. Özünün çoxplanlı və dərin məzmunu sayəsində Don Kixot adi nəzirə çərçivəsindən çıxıb insan dühasının yaratdığı ən böyük əsərlərdən biri olmuşdur.

Don Kixot Avropa tarixinin bütöv bir epoxasının ensiklopediyasını özündə yaşadır. Bu əsərdə o dövrün bütün təbəqələrindən olan 669 surət iştirak edir. Servantes Don Kixotda dəfələrlə oxucuya xatırladır ki, onun əsas məqsədi insanlarda uydurulmuş hadisələrə nifrət oyatmaqdan ibarətdir. Servantes öz məqsədinə çatmış və doğrudanda cəngavərlik romanlarına dağıdıcı zərbə

vurmuşdur. Lakin Don Kixot parodiya deyil, o dünya əbiyyatının möhtəşəm abidələrindəndir.

Ədəbiyyat Ensiklopediyası parodiyaya belə tərif verir: "Parodiya ədəbi bədii yamsılamaq janrı olaraq, hər hansı bir əsəri,müəllifi, ədəbi istiqaməti janrı ələ salmaq deməkdir." Tam aydındır ki, Servantesin əsəri bu anlayışa uyğun gəlmir, baxmayaraq ki, bəzi tədqiqatçılar onun süjetinin Qalliyalı Amadis ilə oxşar olduğunu göstərirlər. Lakin Servantesin məqsədi cəngavərlik romanlarının bütün pis nümunələrini verməkdən ibarət olmuşdur. Bu məqsədin yerinə yetirilməsi üçün isə o cəngavərlik romanlarına xarakterik olan ümumi xüsusiyyətləri verməli olmuşdur. Servantesin bu romanına müraciət edən demək olar ki, bütün tədqiqatçılar qeyd edirlər ki, bu əsərdə əks olunan həqiqətlər eyni mənalı deyildir, burada müxtəlif dünyalar mövcuddur, burada müxtəlif səviyyəli reallıqlar toqquşur və bir-birlərinə qarşılıqlı təsir göstərirlər.Romanın şıltaq və həm də dəmir məntiqli kompazisiyası, bu haqqda müxtəlif tipli şərhlərin edilməsinə gətirib çıxarır. Bəziləri onun cəngavər romanlarının sxemləri əsasında yazıldığını, digərləri onun klassik Aristotel sxemində yazıldığını, bəziləri isə Servantes romanının Barakko bədii sisteminə uyğun olduğunu qeyd edirlər.

"Cəngavərlik romanlarının kompozisiyası sxematik olaraq qəhrəman-cəngavərin obrazı ilə birləşən sonsuz epizodlar zəncirindən ibarətdir." "Renessans əsəri insanın dərk etdiyi dünyanın modelidir Bu əsərlərin kompozisiyası öz sadəlikləri ilə diqqəti cəlb edirlər." "Tipik barakko dövr əsərinin kompozisiyası motivlərin sonsuz inkişafı ilə müəyyən edilir ki, bu da müəllifin dünyagörünüşünü əks edir, bu əsərlərin motivləri həyatın mənasızlığını, səmərəsizliyini, reallığın illuziyalaşdırılmasını (məs.dünyanın teatr kimi qəbul edilməsi) əks etdirir."

Bu prinsiplərin hər biri "Don Kixot" əsərinin kompazisiyasına daxildir. Qəhrəmanın birinci gedişi məhz cəngavərlik romanlarının sxemi üzrə təşkil olunmuşdur. Əsərin bu hissəsi iki kompozisiya səviyyəsinə malikdir; onlardan

biri-realdır (cəngavərin karvansaraya gəlişi, böyük yolda tacirlərlə görüşü) ikinci isə-idealdır (qadına müraciət, qadın uğrunda ilk döyüş). Qəhrəmanın ikinci gedişi də belə təşkil edilmişdir. Bir neçə epizodu çıxmaq şərti ilə real plan-yel dəyirmanları, monarxlar, səyahət edən qadın, karvansarada gecələmə; cəngavərin planı-nəhənglərlə döyüş, qəsrə gəlmək, əsir alınmış şahzadəni xilas etmək üçün vuruş, iki ordunun döyüşü, öldürülmüş cəngavərin meyidi və s. Yuxarıda qeyd etdiyimiz epizodlar isə tam ayrı şəkildə təşkil edilmişdir. Əsir şahzadənin gözətçisi biskaylı ilə döyüşdən sonra çobanlarla qarşılaşır, onları başqa cür qəbul etməməsi ilə reallıq bir tipli olur. Lakin elə o dəqiqədə bu vahidlik dağılır-əvvəlcə Don Kixotun Qızıl əsr haqda söylədikləri ilə sonra isə Don Kixotun Rosinantıtı təhqir edən naxırçılarla döyüşməsi bu vahidliyi pozur. Bu səhnənin bir planı var-cəngavər öz rəqiblərini aşağı səviyyəli adamlar sayır və onun şüurunda yeganə bir dönüş var ki, buda onun özünü ideallaşdırması və sevimli qəhrəmanları kimi təkbaşına bir ordunu məhv edə biləcəyinə inanmasıdır. (Mən təkbaşına yüz adama dəyərəm) Məhbusları azad etmə epizodunda reallıq hamı üçün eynidir, lakin Don Kixotun hərəkətləri başqa obrazların hərəkətlərindən fərqlənir. Qəhrəmanın davranışındakı bu çatışmamazlıqlar təkcə cəngavərlik peşəsindən deyil, həm də abstrakt- humanizm idealı ilə müəyyənləşir. Bu ideal isə insan şəxsiyyəti üzərində bütün zorakılıqları istisna edir. Bu iki plan arasındakı fərqlər isə epizodun düyününün açılmasına gətirib çıxarır. Humanizm ideallarına uyğun olaraq, əsirləri azad edən Don Kixot cəngavərlik təsəvvürlərinə tabe olaraq, onları Taboslu Dulsineyanın hüzuruna getməyə məcbur etmək istəyir ki, nəticədə silahdaşı ilə birlikdə döyülür. Əsərin cəngavərlik romanlarına parodiya olması onun yalnız bir elementidir. Don Kixot realist əsər olaraq, köhnə feodal şuru ilə mübarizəyə aparmaq vəzifəsini daşıyır. "Don Kixot" romanı ilk növbədə cəngavərin qeyri-adi təəsurat və fantastik qəhrəmanlıq əməllərinə həsr olunmuşdur. Tarixin canlı parçası olan Servantesin "Don Kixot"u-axırıncı cəngavərdir, məhz buna görədə o Qəmli Sifət Cəngavərdir. Nə vaxtlarsa varlı, güclü, rəqadətli cəngavərlər yaşamışlar. Onların silahdaşları ləyaqətli müttəfiq,

sevdikləri və uğrunda döyüşdükləri qadın qeyri-adi gözəl, atları cəngavərlərə layiq at olmuşdur. Onların qəhrəmanlıqları əfsanələrin yaranmasına layiq olmuşdur. Lakin bu artıq uzaq keçmişdə qalmışdır. İndi əsilzadə Alonso Kixano qoca, arıq, tənha və kasıbdır. Onun qalxanı kartondandır, silahdaşı sadə kəndli, qadını isə kobud kənd qadınıdır. Onun silahdaşının isə heç yabısıda yoxdur, o eşşəkdə gəzir. Alonso Kixano nəhənglərlə deyil, yel dəyirmanları ilə vuruşur. İncidilmişləri deyil, cinayətkarları qoruyur. Daima xeyirxahlıq etmək eşqiylə yanıb, pislik edir, ilk növbədə isə-insanların yaşamasına mane olur. Hamı ona yalvarır ki, o onları öz yaxşılıqlarından və müdafiəsindən azad etsin. Bütün bunlar isə onun real həyata yad olmasından irəli gəlir. Don Kixot avtomatiki olaraq, gözlənilən nəticəni verməyən hərəkətlər edir, onun komikliyi də məhz elə bunladır. Bu mexaniklik isə Don Kixotun həyat təcrübəsindən heç nə öyrənməməsindən irəli gəlir. O həqiqətəndə hərəkətlərinin düzgün olmasına əmindir. Onun arqumentləri sarsılmazdır: Axı məşhur cəngavər məhz belə hərəkət edirdi, axı qorxmaz cəngavərin başına belə işlər gəlirdi. Cəngavərlərin qəhrəmanlıqları və sərgüzəştləri haqda oxuyub, yadda saxladığı xatirələr yolda onun üçün kompası və coğrafi xəritəni əvəz edir. Onların həyat tərzi- Don Kixot üçün yeganə həqiqəti anlama mənbəyidir. O tarixi tarixin bir dəqiqəsini danışmaqla əvəz etmək istəyir, və arzulayır ki, həyat bu dəqiqədə dayansın, başqa sözlə desək, o, tarixin gedişini saxlamağa çalışır. Şərəfli qələbəyə çatmaq üçün edilən cəhdlər ona gətirib çıxarır ki, o hər yerdə döyülür. Dərin inam, sarsılmaz optimistlik, tam mənası ilə öz plan və məqsədlərinin reallığına əminlik necə deyərlər, Don Kixotun sosial-tarixi lunatizmdən əzab çəkməsinin nəticəsidir. O öz xatirələrinin hakimiyyətindədir, o həqiqətdən uzaq olan əfsanələri reallıq kimi qəbul edir.

Servantes üçün Don Kixot nə tip obrazdır? Mənfi yoxsa müsbət? Demək olar ki, o Servantes üçün həm mənfi, həmdə müsbət obrazdır. Çünki, onun çatışmazlıqları ləyaqətliyinin arxa tərəfidir. O gülməli vəziyyətlərə düşür, çünki həmişə xeyirxahlıq etməyə can atır. O özünün qeyri-adi geniş ürəkliliyinə, öz

idealizminə. görə köməkdir. Obrazın belə ziddiyətli olması, bəzilərinə Don Kixotun hərəkətlərini təhlil edib, ona komik qəhrəman kimi baxmağa, digərlərinə isə onun məqsədlərinə, coşqunluğuna, inamına görə onun insan ruhunun zirvəsi, möhtəşəm obraz olması kimi fikirlərin irəli sürülməsinə sövq edir.

Bu isə Servantesin öz yaratdığı obraza ikili münasibətinin nəticəsidir. Bu ikilik nədən irəli gəlir? Bu Servantesin həqiqətə və tarixin yaranmaqda olan yeni mərhələsinə ikili münasibət bəsləməsindən irəli gəlir. Servantes cəmiyyətin elə təbəqəsindəndir ki, bu təbəqə köhnə formanın yeni forma ilə dəyişməsini başa düşmür. Don Kixota gülmək isə həqiqətə konservativ münasibətdən feodalizmin yerinə gələn yeniliyi görməməkdən irəli gəlir.

Don Kixotun müsbət xüsusiyyətlərinə gəldikdə isə o Sanço Pansonun sözləri ilə desək, mavi ürəkli adamdır, idealistdir, böyük əxlaqi keyfiyyətlərə malik olan şəxsdir. O, həqiqətin qələbə çalmasını arzulayır, bütün incidilənlərin müdafiəsinə qalxmağa hazır olan bir adamdır. Don Kixotun idealizmi və moralizmi onun sosial ədalətə can atmağından, dərin humanizmiliyindən irəli gəlir. Don Kixotun idealizmi müqayisə edilməyəcək dərəcədə köhnə patriarxal cəngavərliyin kilsə müdafiəçisi olmasına, İncil ədalətlinə və saf kəndlinin belə ədalətliliyin mümkün olacağına olan utopik inamını əks etdirir. Servantes romanının sonunda öz qəhrəmanını ağıla gətirərək, başa salır ki, o səyahət edən cəngavər amançlı Don Kixot yox, mülayim xasiyyətinə görə xeyirxah adlandırılan adi bir əsilzadə Alonso Kixanodur. Öz dəliliyini başa düşən Don Kixot məhz bununlada öz komikliyindən azad olur. O artıq yazıq dəli kimi yox, adi insan kimi ölür. O gülmək obyektindən hörmət və ehtiram obyektinə çevrilir. Məhz yuxarıda qeyd etdiyimiz bütün cəhətlər Don Kixot obrazını əbədiyaşar edərək, sosial təbəqəsindən asılı olmayaraq hər bir oxuyucuya sevdirir.

# İSTİFADƏ EDİLMİŞ ƏDƏBİYYATLARIN SİYAHISI


1. Azərbaycan Sovet Ensiklopediyası, Bakı 1983 III cild
2. Ədəbiyyat qəzeti 2005 № 10
3. Штейн А.Л. История испанской литературы издательства. Высшая школа 1976
4. Смирнов П.А. Средневековая литература Испании. Издательство наука 1960
5. Сервантес Мигель де. Собрание сочинения в пяти томах. Издательство «Правда» Москва 1961
6. Кусинов И.П. история литературного героя Москва 1957
7. İnternet ünvanı: ingenioso hidalgo don Auyotede la manchanttp://servantes, alcala. ts /oliote/ oliyj.htm

# EL TEMA DE FICCIÓN Y REALIDAD EN DON QUIJOTE

**Jale GANBARLI,** ADU

Desde el prólogo hasta la última pagína, Don Quijote se describe como un ataque orientado a "derribar la máquina mal fundada de los libros de caballerias". El tema aparece al principio y fin de las dos partes. Sería difícil encontrar a un autor y obra que más claramente declararan su propósito.

Cuáles eran los libros de caballerias de que Don Quijote trata. Los libros de caballerias españoles contienen biografias de péroes de siglos anteriores. De sangre real, por peripecias diversas viven seperados de sus padres desde la niñez. Haciéndose arman caballeros, andan por el mundo y encuentran aventuras. Su campo es preferiblemente lugares exóticos de la Europa oriental y Asia. Pueden o no tener un escudero, pero suelen viajar con amigos. Al caballero andante le gusta la floresta y la vida libre, pero aborrece la soledad. Las aventuras pueden pripiciarse por el socorro a gentes necesitatades urgentemente de su ayuda reyes y reinas cuyos reinos han sido invadidos,rebeldes que amenazan el orden público en partes remotas,mujeres burladas,personas cautivadas que precisan el brazo del caballero para ponerse en libertad. Ellos propagan con sus armas la religión cristiana.Muchas veces tienen en dabio o mago como mecenas. Participan en torneos y ganan atención femenina. No es rara la vicisitud de un personaje preso muchos años por encantamiento. Al final llegan a conocer su verdadera identidad, a casarse y a ser coronados. Entonces tienen que quedarse en la corte para desempeñar sus responsabilidades, pero engendran hijos que repiten el ciclo.

La primera parte de Don Quijote es una burla, es decir un ataque en clave de humor, dirigido a los libros de caballerias. Servantes los ridiculizó para que

sus lectores dejaran de leerlos, o al menos de creerlos. En los libros de caballerias españoles, el protagonista es un joven y hermoso hijo de rey. Su abolengo y las circunstancias de su nacimiento se describen detalladamente. En cambio, Don Quijote - sólo al final identificado como Alonso Quijano – es un homre sin historia, n hijo de nadie. Un antitesis de hérol, es feoy viejo, con armas herrumbrosas y un flaco rocin por montura.

El tema de la realidad y el encantamiento. Sancho pronto se da cuenta de la locura de su amo. El positivismo del buen Sancho está basado en las experiencias de su cuerpo. El dolor en las espaldas, los malos efectos que le producen una medicina prepada por don Quijote, ser echado al aire en una manta como un perro,le convencen de que la visión caballerescá del mundo que le relato su amo no corresponde a la realidad.

Para protegerse y para proteger a su amo de futuros daños, Sancho explica a Don Quijote que percibe el mundo erróneamente. Es pedir peras al olmo, es decir, es inútul. Don Quijote echa mano del encantamiento, de un mago enemigo, para explicar sus contratiempos. Si tienes funciones corporales, explica Sancho a Don Quijote, no puedes estan encantada. Pero la locura de don Quijote resiste a estos argumentos "Yo sé y tengo para mi que voy encantado" dice. No hay, en efecto, manera de hacer consciente a un loco de su locura. No hay manera de convencer a Don Quijote de que la bacia de barbero no sia un yelmo mágico.

La relación entre ficción y realidad es uno de los temas básicos en el Quijote. La figura del protagonistaencierra en si esa dualidad. Alfonso Quijano se vuelve loco y decide ser el ente ficticio Don Quijote de la Mancho. La locura de don Quijote consiste precisamente en con fundir la vida y el arte, asi cree castillo lo que los demás tienen por venta, se imagina gigantes donde hay molinas. Amadís de Gaula y Durandarte son para él personas tan reales como su sobrina o escudero.

En la primera parte, los encuentros entre Don Quijote y otras personas pueden concebirse principalmente como en frentamientos entre ficción y

realidad. Es decir una persona que vive una vida ficticia y otros que viven en la realidad cotidiana. En el episodio de la cueva, la duda del mismo Don Quijote sobre si es ficción y realidad o sueño lo experimentado, pone de manifesto la realitividad de la realidad. Según Don Quijote, él estuvo en la cueva tres días con sus noches para el primo y Sancho sólo pasó media hora. Esta discrepancia en el tiempo muestra, más que conflicto la realitividad del consepto. El tiempo es sólo una medida que depende de la percepción del que lo experimento.

Esta visión del mundo está presentado en la novela de la forma más sencilla y plausible por dos puntos de vista. Para Sancho la cueva es muerte e infierno, para don Quijote es vida y paraíso.

En otra parte el mundo ficticio inventado por los duques y su mayordomo es un teatro donde Don Quijote y Sancho representan lo que ellos consideran su realidad. Su mundo no es más que un es cenario donde las experiencias han sido determinadas de antemano. Son titeres, cuyas cuerdas están siendo movidas por otros seres más poderosos que ellos, aunque ellos no peraban este ardid. A la posibilidadantes comentada de la vida como sueño, se añade ahora la idea de un ser supremo regidor y planeador de las accianes humanas, pues los duques en un nivel paródico representan el poder divino. De las tensiones dialicticas encontradas en la Primera parte del libro, hemos pasado, casi sin notarlo, a una visión multiforme de la realidad, donde distintos mundos coexisten. La locura de don Quijote se ha extendido. La no se sabe quién es más loco, si él o los que a su alrededor hacen disparates para divertirse. La línea divisoria entre ficción y realidad se ha borrado. Los duques crean una ficción que para don Quijote y Sancho es realidad. Y estos duques que se consideran superiores bureándose de todos, son burlados también.

En el Quijote, mentiras y veros, locura y cordura, ficción y realidad se funden en un mundo relativo y orgánico que parece escoparse al limitado entenedimiento humana.

Cədvəldən göründüyü kimi, ötən əsrin 70-80-ci illərində Azərbaycanda heyvandarlıq sahəsi sürətlə, intensiv inkişaf edirdi. Hətta intensiv inkişafa görə respublika o dövrdə keçmiş İttifaqda birinci yeri tuturdu. Bu inkişaf həm də damazlıq təsərrüfatlarının, damazlıq işinin genişlənməsi, balalarının keyfiyyəti yoxlanılmış buğaların dondurulmuş toxumu ilə aparılan süni mayalanmanın geniş tətbiqi demək idi.

1987-ci ildə heyvandarlığın müxtəlif sahələri üzrə 294 damazlıq təsərrüfat mövcud idi ki, bunun da 46 Azərbaycan camışı, 48-i isə qoyunçuluq üzrə idi. İndi bu təsərrüfatlardan əsər-əlamət belə yoxdur. Əvəzolunmaz heyvan genefondlarımıza qəsd edildi.

Dağıdılmış, talan edilmiş təsərrüfatların yerində yeni təsərrüfat formalarının, fermer təsərrüfatlarının yaradılmasının vacibliyi demək olar ki, heç kəsi düşündürmürdü də.

Mövcud olanlar, yeni yaradılanlar isə şəxsi təsərrüfatlar idi. Bunlar da zəif, dövlət qayğısından, köməyindən uzaq.

Ötən əsrin doxsanıncı illərinin əvvəlində Azərbaycanda heyvandarlığın ümumi mənzərəsi belə acınacaqlı idi.

1993-cü ildə ümummilli liderimiz, mərhum prezident Heydər Əliyev yenidən hakimiyyətə qayıdandan sonra bütün sahələrdə olduğu kimi, aqrar sahədə də böyük dəyişikliklər baş verdi.

Məhz ulu öndərin məqsədyönlü siyasəti sayəsində tezliklə genişmiqyaslı islahatlara başlanıldı. Torpaqlar paylanıldı. Beynəlxalq qurumlarla, təşkilatlarla əməkdaşlıq əlaqələri quruldu. Qabaqcıl dünya heyvandarlıq təcrübəsindən geniş istifadə olunmağa başlanıldı. Kənd təsərrüfatının inkişafı üçün yeni imkanlar, mənbələr yaradıldı. Uğurlu kreditləşmə siyasəti aparıldı.

Məhz, mərhum prezident Heydər Əliyevin səyləri sayəsində 90-cı

illərin ortalarında Kənd Təsərrüfatı Nazirliyi yanında Kənd Təsərrüfatında Özəl Bölmənin İnkişafına Yardım Agentliyi yaradıldı. Bu qurumun timsalında Azərbaycan hökuməti ilə Dünya Bankı arasında əməkdaşlıq əlaqələri quruldu. Agentliyin köməyi ilə respublikamızın ayrı-ayrı bölgələrində kənd təsərrüfatının müxtəlif sahələri ilə məşğul olan nümunəvi pilot fermer təsərrüfatları yaradıldı. Bunların da arasında heyvandarlıqla məşğul olan təsərrüfatların xüsusi çəkisi böyük idi. Ötən əsrin sonunda isə kəndli-fermer təsərrüfatlarının sayı artırdı.

Deməli, zamanın özü bu inkişafa, daha dəqiq desək, heyvandar fermerlər arasında əlaqələrin möhkəmləndirilməsinə, maarifçiliyin, qabaqcıl dünya heyvandarlıq təcrübəsinin yayılmasına, bioloji qiymətli, ekoloji təmiz heyvandarlıq məhsulları istehsalının artırılmasına, heyvandarların bu və ya digər problemlərinin həllinə kömək edə biləcək ictimai qurumların yaradılmasını tələb edirdi.

Daha bir mühüm zərurət də var idi. Beynəlxalq ictimai təşkilatlar, FAO kimi qurumlar dövlət qurumları ilə deyil, məhz ictimai qurumlarla əməkdaşlıq etməyə can atırdılar. Xarici investorlar da ictimai qurumlara sərmayə yatırırdılar.

Belə beynəlxalq qurumlarla əlaqə yaratmaq, bu əlaqələri möhkəmlətməklə onların diqqətini, gücünü, potensiallarını ölkəmizdə heyvandarlığın inkişafına yönəltmək, heyvandarlarımızın, fermerlərimizin təşkilatlanmasını sürətləndirmək məqsədilə biz, ölkəmizin kənd təsərrüfatının inkişafında mühüm xidmətlər göstərmiş, tanınmış mütəxəssis, alim, elm və təsərrüfat təşkilatçısı, Beynəlxalq Camışçılar Federasiyasının və həmin təşkilatın Daimi Komitəsinin üzvü, doktor İmran Əbilovla birlikdə FAO-nun sədri doktor Çiançarlo Rossiyə məktub yazdıq. **(Böyük əhəmiyyətini**

**nəzərə alaraq məktubun tam mətnini dərc edirik – red.)**

2000-ci il yanvar ayının 10-da yazdığımız məktubda Azərbaycanda heyvandarlığın ümumi vəziyyəti, onun inkişaf perspektivləri, xüsusən də camışçılığın elmi əsasda inkişaf etdirilməsi, camışçılıq elmimizin tarixi, nailiyyətləri barədə müfəssəl məlumat verdik.

Cənab Rossiyə yazdığımız məktub diqqətlə, böyük maraqla qarşılandı. Hələ 1964-cü ildə İtaliyanın Trento şəhərində keçirilmiş V Beynəlxalq Elmi Konqresdə tanış olduğum, sonralar daim elmi fikir mübadilələri apardığım doktor Rossi ilə və onun rəhbərlik etdiyi qurumla əlaqələrimiz daha da möhkəmləndi. Və bu əlaqələrimiz, həmin təşkilatın Azərbaycanda heyvandarlığın inkişafına göstərdiyi maraq, verdiyi önəm də bizim təşkilatlanmağımıza böyük təkan verdi.

Yuxarıda sadaladığımız zərurətlərin, həm də FAO-ya yazdığımız məktubun Azərbaycan Heyvandarlar Cəmiyyəti İctimai Birliyi - Assosiasiyası yaradıldı.

2000-ci ilin axırına yaxın, respublikanın 54 rayonundan gəlmiş heyvandarlıqla məşğul olan fermerlər təmsil edən nümayəndələrin iştirakı ilə Kənd Təsərrüfatı Nazirliyində heyvandar fermerlərin yeni qurumunun Heyvandarlar Cəmiyyəti İctimai Birliyinin yaradılması və onun rəhbər heyətinin seçilməsinə həsr olunmuş ümumi yığıncaq keçirildi.

Yığıncaqda heyvandarlıq sahəsi ilə məşğul olan tanınmış alim və mütəxəssislər, Kənd Təsərrüfatı Nazirliyinin rəhbərliyi, nazir və nazir müavinləri ayrı-ayrı idarə və qurumların rəhbərləri və mətbuat nümayəndələri iştirak edirdilər.

Nazir İrşad Əliyevin sədrliyi ilə keçirilən bu yağıncaq haqqında "Azərbaycan fermeri" jurnalının 2000-ci il tarixli, 2 sayında yazılır: "Heyvandarlıqla məşğul olan fermerlərin respublika yığıncağı keçirilmişdir. Yı-

ğıncaqda heyvandar fermerlərin respublika cəmiyyəti təsis edilmiş, cəmiyyətin Mərkəzi Şurası və idarə heyəti seçilmişdir.

Tanınmış kənd təsərrüfatı mütəxəssisi, vaxtilə Hindistan, Əlcəzair, Çili və Əfqanıstanda damazlıq heyvandarlığın təşkilinə və inkişafına elmi və böyük təcrübəvi kömək göstərmiş Əyyub Bəşirov cəmiyyətin sədri, Abşeron Quşçular Cəmiyyətinin sədri Tofiq Tağıyev, Göyçay rayonundakı "Qarabulaq" fermer təsərrüfatının başçısı Əlibala Şükürov və Xızı rayonundakı "Arıçı" fermer təsərrüfatının başçısı Şamil Quliyev isə sədrin müavinləri seçilmişlər".

Birliyin yaradılmasında əsas məqsəd, qurumun nizamnaməsində **(Nizamnamənin mətni aşağıda dərc edilir – red.)** göstərildiyi kimi, respublikada heyvandarlığın inkişafına, heyvandarlıqla məşğul olan fermerlərə həm elmi, həm də təcrübəvi kömək göstərmək, eyni zamanda fermer təsərrüfatlarının işini düzgün istiqamətləndirməkdir.

Bir az da geniş desək, birlik heyvanlarlar arasında kooperasiya əlaqələrinin inkişafına, bu sahədə fəaliyyət göstərən qurumların qazandığı təcrübələri beynəlxalq heyvandarlıq təcrübələri ilə ümumiləşdirmək, öyrənib təbliğ etmək, kənd təsərrüfatı məhsullarının istehsalı, emalı, marketinqi məsələlərinin öyrənilməsi, mal-qaranın cins tərkibinin yaxşılaşdırılması və bununla yanaşı süni mayalanmanın heyvandarlıqda geniş tətbiqi, heyvandarlar arasında zootexniki biliklərin artırılması, elmin və qabaqcıl təcrübənin əldə etdiyi nailiyyətlərin tətbiqi, eləcə də beynəlxalq qurumlarla, qeyri-hökumət təşkilatları ilə əlaqələr qurmaq, onlarla birlikdə layihələrin həyata keçirilməsi kimi mühüm xalq təsərrüfatı əhəmiyyətinə malik və s. məsələlərlə məşğul olmağı öz qarşısına qoymuşdur.

Göründüyü kimi, yeni təsis edilən qurum öz üzərinə olduqca mü-

hüm, dövrün, zamanın nəbzini tutan vəzifələr götürüb.

Bu vəzifələrin həyata keçirilməsi üçün öncə təşkilatlanmaq, işləri düzgün istiqamətləndirmək, qurmaq lazım idi. Birliyimiz təsis olunduğu gündən də məhz bu istiqamətdə fəaliyyətə başladı.

Əvvəlcə dövlət qeydiyyatından keçmək lazım idi. Keçdik, ancaq böyük zaman fərqi ilə. Təsis yığıncağı 2000-ci ildə keçirilən bir qurum Respublika Ədliyyə Nazirliyində 2005-ci il iyunun 30-da qeydiyyata alındı.

Cəmi bircəcə günlük iş üstündə beş il vaxt itirməyə dəyərdimi?! Niyə belə bir xırda məsələ böyük problemə çevrildi?! Aşağıda yeri gələndə bu və ya digər problemlər üzərində dayanacağıq.

Birlik təsis yığıncağından sonra fəaliyyətə başlayarkən öncə geniş təbliğat, izahat və məsləhətlər verilməsi, fermerlərə təcrübəvi kömək göstərilməsi, heyvandarlığın elmi əsasda təşkili və inkişaf etdirilməsi işlərinə önəm verdi.

Təbii ki, öncə kəndli-fermerlər, heyvandarlar arasında geniş təbliğat, izahat, məsləhət verilməsi, gündəlik qarşıya çıxan məsələlərin həllində kömək göstərilməsi işlərinə başlanıldı. Qurumun yaradılması zəruriliyi, onun məqsəd və vəzifələri, fəaliyyət istiqamətləri və s. haqqında davamlı söhbətlər aparıldı.

Müxtəlif kütləvi-informasiya vasitələri ilə əlaqələr quruldu. Qəzetlərdə elmi-publisistik, tövsiyyə xarakterli yazılar dərc edildi. Bu yazılarda təkcə İctimai Birlik haqqında deyil, həm də heyvandarlığın bütün sahələri və bunların, mövcud problemləri barədə müfəssəl bəhs olundu. Radio və televiziyalarda müxtəlif səpkili çıxışlar edildi.

İctimai Birliyin nizamnaməsində nəzərdə tutulduğu kimi, özümüzün mətbu orqanımız yaradılmalı idi. Lakin maliyyə vəziyyətimiz buna imkan vermir.

Amma, bu işin ağırlığını 2005-ci ildən 2008-ci ilə qədər "Azərbaycan elmi", 2007-ci ildən bu günə qədər də "Elmi iş" jurnalları öz üzərlərinə götürdülər. Bu jurnalların bizə etdiyi köməyin dəyərini, miqyasını nə bir ölçüyə gətirə, nə də təsəvvür edə bilirəm. Bu əsl fədakarlıqdır! Belə fədakarlığın ilk nümunəsini böyük mütəfəkkirimiz Həsən bəy Zərdabi göstərmişdir. O böyük alim və naşir təkcə milli mətbuatımızın deyil, həm də XIX əsrin sonu və XX əsrin əvvəllərində Azərbaycan heyvandarlığında, ilk dəfə olaraq, damazlıq işinin elmi və təcrübəvi əsasını qoymuşdur.

Fəxr edirəm ki, bu gün də jurnalistlərimiz mənəvi babalarının adına layiq çalışır, bizə də əllərindən gələn köməyi əsirgəmirlər. Hər iki jurnalın əməkdaşlarına öz dərin minnətdarlığımı bildirirəm.

İctimai Birliyimiz yarandığı gündən onun bir çox ağırlıqlarını, xüsusən də mühasibat işlərinin aparılmasını VES KONSUTANCU LLC şirkəti öz üzərinə götürdü. Yeri gəlmişkən, həmin şirkətin rəhbərliyinə, kollektivinə təşəkkürümü bildirirəm.

Heyvandarlar Cəmiyyəti İctimai Birliyi tərəfindən müəllifi olduğum üç kitab nəşr edilib. 2005-ci ildə "Azərbaycanda damazlıq heyvanların biologiyası və yetişdirilməsi", 2008-ci ildə "Azərbaycanda damazlıq heyvandarlığın problemləri və inkişafının elmi əsasları", 2009-cu ildə isə Rusiya Kənd Təsərrüfatı Elmləri Akademiyasının sifarişi ilə, rus dilində, "Физиологоя репродуктивной функции буйболов Азербайджана" ("Azərbaycan camışının törəyib çoxalmasının fiziologiyası") adlı kitablar işı üzü gördü.

Bu kitablar heyvandar fermerlərə sahənin inkişaf etdirilməsində, məhsuldarlığın artırılmasında, bioloji qiymətli, ekoloji təmiz məhsul istehsalında, xalqımıza məxsus qiymətli genefondların qorunub saxlanılmasın-

da, damazlıq işlərinin elmi əsaslarla aparılmasında, qısırlığın aradan qaldırılmasında, süni mayalanmanın geniş miqyasda tətbiq edilməsində qiymətli məxəzdir.

İctimai Birlik nəşr olunmuş, hərəsi 500 tirajla çap edilmiş kitabları fermerlər arasında, eləcə də sahə ilə məşğul olan qurumlara, mütəxəssislərə, elm ocaqlarına, alimlərə təmənnasız, xeyriyyəçilik məqsədi ilə payladı.

İctimai Birliyimiz beynəlxalq elmi qurumlarla, beynəlxalq qeyri-hökumət təşkilatları ilə sıx əlaqələr qurub. Bundan da məqsəd dünyanın qabaqcıl heyvandarlıq elmi və təcrübəsinin Azərbaycanda yayılmasıdır.

Bu əlaqələr Rusiya elmi təşkilatları, elm ocaqları ilə daha sıxdır. Rusiya Kənd Təsərrüfatı Elmləri Akademiyası, Rusiya Federasiyası Beynəlxalq Keyfiyyət Problemləri Akademiyası, Moskva Mərkəzi Yemlərin texnologiyası və kənd təsərrüfatı heyvanlarının yemləndirilməsi Elmi Tədqiqat İnstitutu, akademik Timiryazyev adına Moskva Dövlət Kənd Təsərrüfatı Akademiyası ilə mütəmadi əlaqələrimiz var. Vaxtaşırı yazışır, görüşür, fikir, təcrübə mübadilələri aparırıq.

2004-cü il mart ayının 22-24-də Rusiya Beynəlxalq Keyfiyyət Problemləri Akademiyasında akademik V.K.Milovanov və professor İ.İ.Sokolovskayanın anadan olmasının 100 illik yubileyləri münasibəti ilə keçirilən beynəlxalq elmi konfransda bizim "Методы и технологоя искуственного осеменения и прогресс в животноводстве Азербайджана" ("Süni mayalamanın metod və texnologiyası və Azərbaycanda heyvandarlığın tərəqqisi") mövzusundakı elmi məruzə 357 məruzə arasında birinci yeri tutdu. Elə buna görə də Rusiya Federasiyası Keyfiyyət Problemləri Akademiyası bizi özünün həqiqi üzvü, akademiki seçdi. Rusiya Ali Attestasiya Komissiyası isə biologiya elmləri doktoru elmi dərəcəsi verdi. Rusiya Kənd Təsərrüfatı Elmləri Akademiyası və Ümumrusiya heyvandarlıq İnstitutu isə özlərinin

fəxri fərmanına layiq gördü.

Ötən il aprelin 15-də Moskvada, həmin elmi təşkilatlarda növbəti görüşlər oldu. Akademik L.K.Ernstin 80 illik yubileyi münasibəti ilə Rusiya Kənd Təsərrüfatı Elmləri Akademiyasında, URHİ-da yığıncaqlar keçirildi.

Təbii ki, biz də ora, necə deyərlər, əliboş getməmişdik. 2005-ci ildən bu ilin aprelinədək çap olunmuş, bayaq adlarını çəkdiyim, kitablardan və jurnalların bütün saylarından, o cümlədən də "Физиология репродуктивной функции буйволов Азербайджана" kitabından da aparmışdım.

Rusiya Kənd Təsərrüfatı Elmləri Akademiyasının vitse-prezidenti, Rusiya Ali Attestasiya Komissiyasının sədri, akademik Lev Konstantinoviç Ernst və Moskva Mərkəzi Yemlərin texnologiyası və kənd təsərrüfatı heyvanlarının yemləndirilməsi Elmi Tədqiqat İnstitutunun direktoru, akademik Ludviq Henrixoviç Boyarski və onların rəhbərlik etdikləri kollektivlərlə geniş söhbətlər apardıq. Onlar İctimai Birliyimizin gördüyü işlərlə dərindən maraqlandılar. Birliyin işləri barədə mütəssəl məlumat aldıqdan və təqdim etdiyimiz kitab və jurnallarla, çap olunmuş əsərlərlə tanışlıqdan sonra heyrətlərini gizlədə bilmədilər. Adlarını çəkdiyim həmin elm ocaqlarının bir çoxunda kitablar, jurnallarda dərc olunmuş elmi məqalələr geniş müzakirə edildi, onlar barədə fikir mübadilələri aparıldı.

Rusiya Kənd Təsərrüfatı Elmləri Akademiyasında müzakirələr zamanı rus aqrar elmi məktəbinin iki nəhəng nümayəndəsi, akademik L.K.Ernstin və akademik L.H.Boyarskinin Azərbaycan aqrar elmi məktəbinə, mətbuatımıza, "Azərbaycan elmi" və "Elmi iş" jurnallarına, Azərbaycan Heyvandarlar Cəmiyyəti İctimai Birliyinin az müddət ərzində gördüyü işlərə yüksək qiymət vermələri bir elm adamı, aqrar sahənin mütəxəssisi kimi mənim üçün çox qiymətli idi. Xüsusən də akademik L.K.Ernstin de-

diyi, - Vı nas operedili, - sözləri işlərimizə verilən yüksək qiymət idi.

Onlar hər iki jurnalın nüsxələrindən, kitablarından adlarını çəkdiyim elm ocaqlarının kitabxanalarına, Kənd Təsərrüfatı Muzeyinə götürdülər.

Hazırda yeni kitablar üzərində işlər aparılır. "Azərbaycanda biologiya elminin və heyvandarlığın inkişaf tarixindən" adlı kitab isə çapa tam hazırdır. "Elmi iş" jurnalının bütün saylarında alimlər, mütəxəssislər, fermerlər üçün böyük elmi və təcrübəvi əhəmiyyət kəsb edən məqalələr dərc edilir.

Bu gün FAO ilə əlaqələrimiz müntəzəm xarakter daşıyır. Yuxarıda haqqında bəhs etdiyimiz məktubdan, FAO-nun direktoru, doktor-professor Rossiyə, Azərbaycanda camışçılığın problemləri və inkişaf etdirilməsi məsələləri ilə bağlı yazdığımız məktub bu əlaqələri sürətləndirdi.

FAO-nun Avropa və Asiya ölkələri üzrə koordinatoru, Hindistanın dünya şöhrətli alimi, doktor-professor Tanejanın 2005-ci ildə Bakıya üçgünlük səfəri isə əməkdaşlığımızın daha da inkişaf etməsinə səbəb oldu. Həmin üç günün ikisində doktor Taneja müvafiq qurumların rəhbərlikləri ilə görüşlər keçirdi. Səfərin üçüncü gününü isə bütövlükdə bizimlə görüşə sərf etdi.

Həmin gün evimizdə qonaq olan doktor Taneja ilə birlikdə Azərbaycanda və dünyada camışçılığın inkişafı ilə bağlı, eləcə də damazlıq, süni mayalandırma, qiymətli heyvan genefondlarının qorunub saxlanılması və səmərəli istifadə olunaraq inkişaf etdirilməsi, heyvandarlıq məhsullarının, xüsusən də camışçılıq məhsullarının istehsalı və s. bu kimi məsələlər ətrafında məsləhətmələr, fikir mübadilələri apardıq.

Qayıdandan sonra doktor-professor Taneja bizə göndərdiyi təşəkkür məktubunda yazırdı ki, Azərbaycanda və dünyada camışçılığın inkişaf etdirilməsi siyasətini Sizin verdiyiniz məsləhətlər və tövsiyələr əsasında biz

yenidən qurduq.

Bir elm adamı kimi bizim verdiyimiz tövsiyələrin, məsləhətlərin FAO-nun fəaliyyət proqramında, inkişaf siyasətinin müəyyənləşdirilməsində, qurulmasında istimfadəsi elə Azərbaycan aqrar elminin dünya miqyasındakı nüfuzundan xəbər verir. FAO ilə əlaqələrimiz bu gün də davam edir. Azərbaycan Camışçılar Assosiasiyasının sədri, kənd təsərrüfatı elmləri namizədi Akif Fərəcovla birgə bu qurumun dərgilərində vaxtaşırı camışçılığın bu və ya digər problemləri ilə bağlı elmi məqalələr dərc etdiririk.

Azərbaycan Heyvanlar Cəmiyyəti İctimai Birliyi respublikamızın elm ocaqları ilə də sıx elmi əlaqələr qurub. AMEA-nın elmi tədqiqat institutları, Zoologiya İnstitutunun biologiya sektorunun alimləri, Baytarlıq İnstitutu, Azərbaycan Elmi-Tədqiqat Heyvandarlıq İnstitutu və onun Abşeron Elmi Təcrübə Stansiyası, Azərbaycan Dövlət Aqrar Universiteti, Biolojimüxtəliflərinin qorunması (genetika) İnstitutu, Yemçilik İnstitutunun elmi kollektivi ilə sıx əlaqələrimiz var.

Aqrar elmimizin nəhəng simaları akademiklər Cəlal Əliyev, Musa Musayev, eləcə də MM-in aqrar-siyasət komissiyasının sədri Eldar İbrahimov tez-tez birliyimizin işləri ilə maraqlanır və öz məsləhətlərini verirlər. Akademik Musa Musayev nəşr etdirdiyimiz kitabların həm elmi redaktoru, həm də ön sözlərinin həmmüəlliflərindəndir.

İctimai Birliyimizin ən mühüm fəaliyyət istiqamətlərindən biri də fermerlərə və heyvandar kəndlilərə gündəlik məsləhətlərin verilməsidir. İstənilən vaxtda birliyin mütəxəssisləri, şəxsən özüm, qaldırılan bütün məsələləri təmənnasız olaraq, yerindəcə, istər elmi-nəzəri, istərsə də əyani, təcrübəvi məsləhətldərimizi verərək həll edirik. Bu məsələdə heç bir məhdudiyyət ola bilməz.

Məsələn, yaşadığım Əzizbəyov rayonunda heyvandarlıqla məşğul olanlara heyvanların xəstəliklərinə qarşı mübarizədə, yem bazasının yaradılmasında, heyvanların yemləndirilməsinin yaxşılaşdırılmasında, süni mayalanmanın aparılmasında, sağlam balaların əldə edilməsində, qısırlığın aradan qaldırılmasında lazımi köməklik göstərir, hətta rektal müayinə aparır, qısır-boğazlıq, balanın neçə aylıq olmasını təyin edir, onlarla bağlı məsləhətlərimizi veririk.

Azərbaycan Heyvanlar Cəmiyyəti İctimai Birliyinin, öz nizamnaməsinə uyğun olaraq, respublikamızın rayonlarında və Naxçıvan Muxtar Respublikasında da filiallarının yaradılmasını nəzərdə tutur.

İctimai Birliyin yaranması həm də heyvandarlığın ayrı-ayrı sahələrinə aid ictimai qurumların yaradılmasına təkan verdi.

Azərbaycan Camışçılar Assosiasiyasının (sədri kənd təsərrüfatı elmləri namizədi Akif Fərəcov) və Azərbaycan Arıçılar İttifaqının (sədri texnika elmləri namizədi Şamil Quliyev) yaradılması ölkəmizdə heyvandarlığın inkişafına doğru atılmış uğurlu addımlar oldu.

Heyvandarlığın digər mühüm sahələri üzrə də assosiasiyaların yaradılması da planlaşdırılır. Atçılıq, dəvəçilik, qoyunçuluq, quşçuluq, balıqçılıq, ipəkqurdu sahələrinə aid ictimai qurumların yaradılmasına aid işlər aparılır. Gələcəkdə heyvandarlığın bütün sahələrinə aid belə qurumlar yaradılacaq.

Camışçılıq və Arıçılıq assosiasiyaları öz fəaliyyətlərini ölkəmizdə heyvandarlığın, özü də ən gəlirli, ən sərfəli, ekoloji təmiz, bioloji yüksək qiymətli məhsul verən, həm iqtisadi, həm də insan sağlamlığına xeyirliliyi, tibbi baxımdan da ən dəyərli sahələrinin inkişafına yönəltməklə iqtisadiyyatımızın daha da güclənməsinə, əhalinin firavanlığının yüksəlməsinə böyük köməklik göstərmiş olurlar.

Azərbaycan Camışçılar Assosiasiyasının təsis yığıncağı 2001-ci ilin dekabr ayında keçirilib. Yığıncaqda Beynəlxalq Camışçılıq Assosiasiyasının vitse-prezidenti, Bolqarıstan Camışçılar Assosiasiyasının prezidenti, professor Aleko Aliksiyev və Almaniya-Azərbaycan Dostluq Cəmiyyətinin sədri, doktor Dur iştirak etmişdilər. Bu da belə bir qurumun yaradılmasına beynəlxalq ictimai təşkilatların, ilk növbədə FAO-nun verdiyi önəmdən, əhəmiyyətdən xəbər verirdi.

Azərbaycan Camışçılar Assosiasiyası 2003-cü ilin avqust ayında Ədliyyə Nazirliyində dövlət qeydiyyatından keçdi.

Assosiasiya Neftçala, Bərdə, Ucar, Göyçay və s. kimi rayonlarda yaradılmış camışçılıqla məşğul olan fermer təsərrüfatlarını öz ətrafında birləşdirdi ki, bu da onların fəaliyyətini düzgün istiqamətləndirməyə, damazlıq, süni mayalandırma işlərinin, baytarlıq xidmətinin daha da səmərəli qurulmasına, məhsul istehsalının artırılmasına imkan verdi. Hazırda respublikanın rayonlarında fəaliyyət göstərən 50-yə yaxın fermer təsərrüfatında 100 baş, 20-yə yaxına təsərrüfatda isə 100 başdan da çox camış bəslənilir.

Azərbaycan Arıçılar İttifaqı isə 2008-ci ildə, mart ayının 1-də yaradılıb. Əksər rayonların arıçılıq təsərrüfatını bu qurumda birləşib. Arıçılar İttifaqının əsas məqsədi ölkəmizdə arıçılığı müasir dövrün tələblərinə uyğun inkişaf etdirilməsinə, müasir arısaxlama texnologiyalarının tətbiqinə, damazlıq işlərinin qaydaya salınmasına və daha da yaxşılaşdırılmasına, ölkə və dünya arıçılığının qabaqcıl təcrübələrinin arıçılar arasında geniş yayılmasına, yerli, qiymətli arı geenfondunun qorunub saxlanılmasına, arıçılıq birliklərinin bir araya gətirilməsinə və onların fəaliyyətlərinin daha sıx əlaqələndirilməsinə, nəticədə isə ölkə arıçılığını tam əhatə edə təşkilatlanmaya nail olmaqdır.

Arıçılar İttifaqı öz fəaliyyətində yerli, qiymətli genefondun qorunmasına, damazlıq işlərinə böyük önəm verir. Xızı rayonundakı özəl damazlıq təsərrüfatında il ərzində 3000 ana arı yetişdirilir. Bunlar Bozdağ-Qafqaz arısının Azərbaycanın Qabaqtəpə-Qonaqkənd populyasiyaları üzrədir.

Azərbaycan Heyvanlar Cəmiyyəti İctimai Birliyinin qarşısında duran daha əsas, daha vacib məsələ bundan ibarətdir ki, vaxtilə ölkəmizdə mövcud olmuş, geniş əhatə dairəsinə malik damazlıq sisteminin bərpasına, süni mayalanmanın planlı surətdə, dövlət dəstəyi ilə Azərbaycanın bütün heyvandarlıq təsərrüfatlarında geniş tətbiqinə, camışçılığın və arıçılığın ən gəlirli, ən sərfəli, rentabelli sahə kimi inkişaf etdirilməsinə, ölkədə möhkəm yem bazasının yaradılmasına, heyvandarlıqda məhsul istehsalının artırılmasına digər qiymətli, genefondların (zebu hibridləri, dəvə, yerli, yağlı quyruqlu, yarımqabayunlu, qoyun, yerli at cinslərinin və digər qiymətli heyvan cinslərinin qorunub saxlanılmasına, bu sahələrdə yeni damazlıq təsərrüfatlarının yaradılmasına, fermer təsərrüfatlarının gücləndirilməsinə, yüksək səviyyəli elmi heyvandar kadrlarının, mütəxəssislər korpusunun hazırlanmasına, qabaqcıl dünya elmi və təcrübəsinin yayılmasına yönəlmiş layihələrin həyata keçirilməsinə nail olaq.

Yeri gəlmişkən, damazlıq sistemi və süni mayalama məsələləri barədə bir fikrimi də bildirmək istərdim. Bu gün bu məsələlərdən söhbət düşəndə elə danışırlar, kütləvi informasiya vasitələrində elə yazılar, elə informasiyalar gedir ki, guya bizdə belə şeylər heç yerli-dibli olmayıbmış!

Belə söhbətləri eşidəndə təkcə mənim yox, həyatını bu işlərə sərf etmiş yüzlərlə insanların xətrinə dəyir. Axı, bu insanların əməyi sayəsində 1951-1987-ci illər arasında Azərbaycanda 1 respublika, 2 vilayət, 56 rayonlararası və rayon dövlət döllük-damazlıq stansiyaları, ayrı-ayrı təsərrüfatlarda 1500-ə yaxın süni mayalama məntəqələri, həmçinin, 1951-ci ildə

Neftçala rayonunun Xolqarabucaq kəndində, 1954-cü ildə Kür-Araz Təcrübə Stansiyasında, 1956-cı ildə Az,ETHİ-da, 1972-1976-cı illərdə Neftçala rayonunun M.B.Qasımov adına sovxozda yaradılmış elmi tədqiqat süni mayalama laboratoriyaları fəaliyyət göstərirdi.

Azərbaycan tək özündə deyil, Çili, Əlcəzair, Əfqanıstan kimi ölkələrində damazlıq sistemini yaradıb. Təvazökarlıqdan kənar olsa da deməliyəm ki, həmin ölkələrdə bu işlər bizim rəhbərliyimiz altında görülüb. Çilinin o vaxtkı prezidenti Salvodor Alyendenin Sovet lideri Leonid Brejnevə göndərdiyi teleqramdakı "Mister Ə.Başirovun 45 gündə gördüyü işlər Çilinin ən ali Elmi-Tədqiqat İnstitutlarının 6 ayda gördüyü işlərə bərabərdir" sözləri əməyimizə verilən yüksək qiymətdir.

Ölkəmizə aid təkcə bir faktı gətirmək istərdim. Şəkidəki Daşüz camışçılıq təsərrüfatı keçmiş ittifaqda camışçılıq üzrə yeganə damazlıq zavodu idi.

Camışçılıqda süni mayalamanın qabaqcıl metod və texnologiyalarını ilk olaraq Azərbaycan yaradıb **(E.B.Başirovun müəllifliyi ilə 1951-1954-cü illərdə - red.).** Bu günün özündə də həmin metod və texnologiyalardan dünya heyvandarlıq təcrübəsində geniş istifadə olunur.

Fransızlar bizim tövsiyələrimiz əsasında özlərinin fransız texnologiyasını yaradıblar. 1966-cı ildə Əlcəzairdə çalışarkən bizim təcrübələrldə tanış olmaq məqsədilə ora gələn Fransanın kənd təsərrüfatı naziri, baytarlıq generalı ilə istər təcrübələrimiz, bu təcrübələr zamanı əldə etdiyimiz nəticələr, istərsə də bütövlükdə damazlıq, süni mayalama məsələləri barədə apardığımız söhbətlər, fikir mübadilələri qarşı tərəfdə böyük maraq doğurdu. Tarix boyu Əlcəzairdə 100 ana inəkdən 54 baladan artıq nəticə əldə olunmamışdı. Bizim orada apardığımız təcrübələrimiz zamanı isə hər 100 inəkdən 100-102 buzov, hər 100 ana qoyundan da 111 baş quzu alınmışdı.

Bu isə o dövrdə Şimali Afrika ölkləri üzrə rekord nəticə idi. Fransız generalını da təəccübləndirən də məhz bunlar idi.

O, bizim əldə etdiyimiz nəticələri dərindən öyrənib məsləhətlər, tövsiyələr aldı. Sonralar bizim verdiyimiz həmin tövsiyələr, məsləhətlərimiz əsasında da Fransada yeni bir texnologiya - fransız texnologiyası yarandı.

Bu sahələrdə, qoy, elə belə də deyim, dünyaya biz dərs deyirik, bizimkilər isə gedib həmin sahələrdə ən geridə qalmış ölkələrdən damazlıq işlərini öyrənməyə çalışırlar. Sual olunur, bu işlərin elmi əsası, bünövrəsi bizdə qoyulduğu halda, mütəxəssislərimizin o ölkələrdə nə işi var?! Niyə, ölkəmizdə vaxtilə mövcud olmuş bir sistem indi daha mükəmməl surətdə bərpa olunmur?! Axı, imkan da var, biz də varıq!

Heyvandarlığın inkişaf etdirilməsndə əsas şərt, yüksək keyfiyyətli və bioloji qiymətli yem bazasının yaradılması, süni mayalamanın geniş miqyaslı tətbiqi, ayrı-ayrı kənd rayonlarında baytarlıq xidmətinin yüksək səviyyədə təşkili, dövlətin dəstəyi ilə kənd və rayonlarda süd emalı müəssisələrinin tikilməsi, istifadəyə verilməsidir. Məhz bunlardan sonra bütün problemlər öz-özlüyündə həll olunacaq.

Bizim fəaliyyətimiz belə mühüm məsələlərin həllinə yönəldiyi bir zamanda qarşımıza süni problemlər yaradanlar, mane olanlar da tapılır.

Yuxarıda qeyd etdiyimiz kimi, birliyimizin təsis yığıncağından sonra Kənd Təsərrüfatı Nazirliyində qeydə alınması beş il gecikdirildi. Çünki təsis yığıncağının katibi olmuş Çingiz Fərəcov sənədləri "itirdi". Düz beş il axtardılar, tapılmadı. Gülüncdür, deyilmi?!

Nəhayət, yeni nazir cənab İsmət Abbasov gələn kimi, onun göstərişi əsasında sənədlər yenidən hazırlandı. Kənd Təsərrüfatı Nazirliyində, qeyd edildikdən sonra Ədliyyə Nazirliyində dövlət qeydiyyatından keçirildi.

Birliyimiz qarşısında ofis problemi də dururdu. Bu məsələni də VES

KONSUTANCU LLC şirkətinin köməyi ilə həll etdik. Halbuki, birliyin işinin gücləndirilməsində, onun problemlərinin həllində dövlət qurumları da, qeyri-hökumət təşkilatları da yaxından kömək göstərməlidirlər.

Məsələn, xalq təsərrüfatı üçün böyük əhəmiyyət kəsb edən bir çox layihələrimiz maliyyə çətinlikləri səbəbindən həyata keçirilməmiş qalır. Bax, burada onların dəstəyi vacibdir. Çünkai, söhbət təkcə heyvandarlığın inkişafından yox, ümumən xalqımızın yüksək keyfiyyətli, bioloji qiymətli, ekoloji təmiz ərzaqla təminatından gedir.

Prezident cənab İlham Əliyevin apardığı uğurlu xarici və daxili siyasət sayəsində Azərbaycan nəinki bölgədə, ümumən, dünyada qüdrətli dövlətlərdən birinə çevrilib.

Dünya miqyaslı böhrana baxmayaraq, iqtisadiyyatımız güclənir, inkişaf tapır. Bu inkişaf aqrar sahədə də özünü göstərir.

Biz də prezidentimizin siyasətini dəstəkləyərək, öz elmi və əməli fəaliyyətimizi məhz sahənin inkişafına yönəltmişik.

Bütün çətinliklərə baxmayaraq, İctimai Birliyimiz ölkəmizdə heyvandarlığın inkişafına, məhsuldarlığın artırılmasına, yerli, unikal genefondların qorunub saxlanılmasına və bunların da əsasında yeni, daha məhsuldar cinslərin yaradılmasına, əhalinin yüksək keyfiyyətli, ona sağlamlıq, şəfa verən, ekoloji təmiz, fioloji qiymətli ərzaq məhsulları ilə təminatına, xalqımızın firəvanlığına yönəlmiş çoxsaylı layihələrin həyata keçirilməsini bir vəzifə kimi qarşısına qoyub. Bu məqsədlərə də çatmaq üçün əlimizdən gələni əsirgəməyib, bütün qüvvə və bacarığımızı səfərbər edəcəyik.

# Директору FAO
# господину D-r Giancarlo Rossi

**Глубокоуважаемый D-r Giancarlo Rossi!**

С огромным интересом и благодарностью прочли в информационном бюллетене FAO «Buffal Newsletter» № 11, март 1999, о семинаре по проблемам питания буйволов, проведенном под руководством FAO 8-10 октября 1998 года в Турции (Mustfa Kamal University - Antakya), Очень сожалеем, что из Азербайджана, являющегося древней страной по разведению буйволов, с сильным научным, производственным, кадровым потенциалом и природно-кормовыми ресурсами для широкомасштабного и эффективного разведения буйволов, никто не участвовал. Хотя ученые Азербайджана ранее принимали активное участие во всех международных форумах и мероприятиях, организованных FAO. Так, в сентябре 1964 г. на V международном конгрессе по проблемам биологии воспроизведения и искусственного осеменения животных, проведенном в Италии (г.Тренто), D-г Eyyub Bashirov выступил с очень содержательным докладом на тему; «Биология воспроизведения и искусственное осеменение буйволов», получившем высокую оценку конгресса.

В декабре 1978 года на индийско-советском симпозиуме по буйволоводству, проведенном в Индии, где принимали участие ученые многих стран мира, из Азербайджана участвовала специальная

делегация ученых-буйволоводов, руководимая заместителем министра сельского хозяйства Азербайджанской ССР д-ром Абиловым И.Р., где выступили с докладами профессор Агабейли А.А., д-р Абилов И.Р., д-р Тагизаде С.И. и др.

В сентябре 1984 года нами (д-р Абилов И.Р. и д-р Баширов Э.Б. и др.) в Азербайджане (Баку) был организован советско-индийский симпозиум, посвященный «Современным проблемам племенной работы в буйволоводстве», где принимали участие и выступили с интересными докладами ученые Азербайджана, Грузии, Индии, Болгарии и других стран.

25-31 декабря 1985 г. на I международном конгрессе по буйволоводству в Египте (г. Каир) Д-р Имран Абилов выступил также с интересным докладом на тему: «О состоянии буйволоводства в СССР» и был избран членом Международной Федерации по буйволоводству, а позже Членом Постоянного Комитета этой Федерации, а 13-18 июня 1991 года на Международном конгрессе по буйволоводству в Болгарии (г. Варна) участвовали и выступили с докладами несколько ученых из Азербайджана (д-ры Зульфугар Вердиев, Ашраф Мамедов, Нариман Ширинов).

Должны отметить, что буйвол в Азербайджане разводится с древних времен, и буйволоводство всегда являлось традиционной отраслью народного хозяйства страны. Азербайджан также является пионером первых научных разработок, где под руководством корифея науки в области буйволоводства профессора Агабейли А.А. (1930-1980 г.) были созданы школа ученых буйволоводов и новая Кавказская порода буйволов, в создании которой участвовали и мы.

Учеными-буйволоводами Азербайджана написаны и изданы многочисленные ценные научные труды, учебники, монографии, статьи и др. Написаны и защищены десятки кандидатских и докторских диссертаций, которые нашли свое отражение и в мировой литературе, в том числе и в трудах FAO и ЮНЕСКО.

По решению ЮНЕСКО и FAO были изданы труды проф. А.А.Агабейли (книга «Буйволоводство»), докторов Э.Б.Баширова, М.Г. Алиева и И.Г.Аллахвердиева (книга-сборник «Биология буйволов») и др. труды.

Нами и под нашим руководством коллективом ученых в Аз. НИИЖ, специалистов-селекционеров, животноводов племенной службы Азербайджанской Республики (Аз. ССР) в течение полувека (1951-1999 г.) были разработаны и широко внедрены в производство оригинальные методы, технологии и системы по кормлению, разведению, селекции, воспроизводству и искусственному осеменению буйволов. Были созданы многочисленные крупные буйволоводческие племенные и товарные хозяйства с селекционными стадами. Азербайджан в составе СССР был единственной республикой, широко и традиционно разводящей буйволов: 85% буйволов, находящихся в СССР, приходилось на долю Азербайджана, а 15% разводящихся в других республиках СССР были также происхождением из Азербайджана.

Вся работа, проводимая в бывшем СССР в области буйволоводства, а также бывших соцстранах, координировалось Азербайджаном.

Поэтому не случайно, что в начале шестидесятых годов нам (д-р Баширов Э.Б.) пришлось выполнить очень ценную историческую

миссию, отобрав и отправив грузовым морским транспортом бывшей СССР из Индии (Бомбея) в Болгарию рекордных буйволов породы Муррах, на базе которых в последующем была создана болгарскими учеными всемирно известная, высокопродуктивная порода буйволов «Болгарский Муррах», представители которой как племенной материал используются в Азербайджане для скрещивания с Кавказской породой буйволов.

К сожалению, в переходном периоде после развала СССР мы встречаемся со многими трудностями и проблемами в развитии буйволоводства. Успешно шла приватизация в животноводстве, в т.ч. в бывших буйволоводческих хозяйствах (совхозы и колхозы). Но массовая организация новых буйволоводческих фермерских хозяйств сильно отстает и задерживается из-за отсутствия или недостатка финансирования, а организационные единичные буйволоводческие фермерские хозяйства встречаются с разными трудностями и проблемами, связанными, главным образом, с финансированием.

Кроме того, в республике до сих пор нет единого координационно-консультативного научно-производственного центра по буйволоводству и отделения FAO, что также отрицательно влияет на все проводимые научные и производственные работы в области буйволоводства.

По вышеуказанным причинам во многих районах республики уменьшается численность буйволов. Ценное племенное поголовье буйволов забивается на мясо.

Для организации специализированного координационно-консультативного центра по буйволоводству и отделения FAO по

4.2. Birlik öz öhdəliklərinə görə əmlakı ilə cavabdehdir. Bu əmlak yalnız Azərbaycan Respublikasının qanunlarına uyğun olaraq özgəninkiləşdirilə bilər.

4.3. Birliyin əmlakının pul və digər şəkildə formalaşdırılması mənbəələri aşığadakılardır:

* təsisçilərin və ya Birlik üzvlərinin müntəzəm və ya birdəfəlik üzvlük haqları;

* idarə, müəssisə, yerli və beynəlxalq təşkilatların və vətəndaşların könüllü verdikləri əmək haqları və ianələri, bəxşişlər;

* öz əmlakından istifadə və onun satılması nəticəsində əldə edilən gəlirlər;

* qrantlar;

* sərgilərdən, konsertlərdən və digər tədbirlərdən əldə olunan gəlirlər;

* təsis etdiyi müəssisələrin fəaliyyəti nəticəsində əldə olunan gəlirlər;

* qanunvericilikdə qadağan olunmamış digər mədaxillər.

4.4. Birliyin üzvləri onun mülkiyyətinə daxil olan ayrı-ayrı obyektlər üzərində xüsusi hüquqlara malik deyil.

4.5. Birlik Azərbaycan Respublikasının qanunvericiliyində müəyyən edilmiş qaydada öz fəaliyyətinin məqsədlərinə və əmlakın təyinatına müvafiq olaraq öz əmlakı üzərində sahiblik, istifadə və sərəncam hüququna malikdir.

4.6. Birliyin hesabına daxil olmuş məqsədli vəsait başqa istiqamətlərdə xərclənə bilməz.

4.7. Birlik siyasi partiyalara maliyyə və başqa maddi yardım göstərə bilməz.

4.8. Birlik qanunvericiliklə müəyyən edilmiş qaydada maliyyə, statistik və sair hesabatlar tərtib edir və dövlət orqanlarına təqdim edir.

## V. BİRLİYİN TƏSİSÇİLƏRİ VƏ ÜZVLƏRİ, ONLARIN HÜQUQ VƏ VƏZİFƏLƏRİ

5.1. Birliyin təsisçiləri hüquqi şəxslər (dövlət hakimiyyəti və yerli özünüidarə orqanları istisna olmaqla) və ya 18 yaşına çatmış fiziki şəxslər ola bilərlər.

5.2. Təsisçilər bərabər hüquqlara malikdirlər. Təsisçilərin qarşılıqlı münasibətləri, hüquq və vəzifələri qanunvericiliklə, yaxud onların arasında bağlanmış müqavilə ilə və ya bu Nizamnamə ilə müəyyən edilir.

5.3. Azərbaycan Respublikasında hər bir fiziki və hüquqi şəxs (dövlət hakimiyyəti və yerli özünüidarə orqanları istisna olmaqla) ictimai birliyin üzvü ola bilər. Birliyin təsisçiləri həm də Birliyin üzvləri hesab olunurlar.

5.4. Birliyə üzvlərin qəbulu Birliyin icra orqanları tərəfindən aparılır.

5.5. Birliyə daxil olmaq üçün İdarə Heyətinə yazılı şəkildə müraciət edilir. Ərizəyə bir ay müddətində baxılır. Səsvermə nəticəsində idarə heyətinin üzvlərinin yarıdan çoxu bu məsələyə müsbət münasibətlərini bildirdikdə, ərizəçi Birliyin üzvü seçilmiş hesab edilir.

5.6. Birliyin üzvlərinə Birliyin ali orqanı tərəfindən təsdiq edilmiş formada üzvlük vəsiqəsi verilir.

5.7. Birliyin üzvləri öz aralarında bərabərhüquqlu olub aşağıdakı hüquqlara malikdirlər:

* bu Nizamnamdə və digər sənədlərdə nəzərdə tutulmuş qaydada

təşkilatın idarəçiliyində iştirak etmək;

* Birliyin hər hansı seçkili, o cümlədən rəhbər orqanına seçmək və seçilmək;

* Birliyin fəaliyyətində və təşkil etdiyi tədbirlərdə iştirak etmək;

* Birliyin rəhbər orqanlarının fəaliyyəti barədə məlumat almaq, fəaliyyətinə nəzarət etmək;

* öz mənafelərinin müdafiəsinə kömək göstərilməsi üçün Birliyə müraciət etmək;

* onun hüquq və vəzifələri ilə bağlı hər hansı məsələnin müzakirəsində şəxsən iştirak etmək, Birliyin müvafiq orqanlarına etirazını bildirmək və şikayət etmək.

5.8. Birliyin üzvü eyni zamanda iki seçkili orqanın üzvü ola bilməz.

5.9. Birliyin üzvü yalnız Birliyin müvafiq orqanları səlahiyyət verdikdə həmin orqanı təmsil edə və ya onun adından bəyanatla çıxış edə bilər.

5.10. Birliyin üzvləri aşağıdakı vəzifələri daşıyırlar:

* Birliyin Nizamnaməsinə, həmçinin əxlaq və etika normalarına əməl etmək;

* Birliyin seçki orqanlarının qərarlarını yerinə yetirmək;

* Nizamnamə tələblərinə riayət etmək;

* Birliyin tədbirlərində iştirak etmək.

5.11. Birliyə üzvlük haqqının miqdarı Birliyin İdarə Heyəti tərəfindən müəyyən edilir.

5.12. Birliyə üzvlüyə aşağıdakı hallarda xitam verilir:

* könüllü olaraq Birliyin üzvlüyündən çıxdıqda;

* Birliyin üzvlüyündən çıxarıldıqda.

5.13. Birliyin üzvü aşağıdakı hallarda üzvlükdən xaric edilir:

* Birliyin adına ləkə gətirən hərəkətlərə yol verdikdə;

* mütəmadi olaraq Birliyin işində etməkdən boyun qaçırdıqda;

* Nizamnamə məqsədlərinə zidd hərəkət etdikdə.

5.14. Üzvlükdən, təsisçilikdən çıxarılma İdarə Heyətinin qərarı ilə həyata keçirilə bilər.

5.15. Birlik üzvünün həmin qərardan Birliyin ali idarəetmə orqanına və məhkəməyə şikayət etmək hüququ vardır.

## VI. BİRLİJİN TƏŞKİLATİ STRUKTURU VƏ İDARƏETMƏ ORQANLARI

6.1. Birliyin ali orqanı ildə bir dəfədən az olmayaraq çağırılan Ümumi Yığıncaqdır.

6.2. Ümumi Yığıncaq Birliyin icra orqanının, təsisçilərdən birinin və ya üzvlərinin üçdə bir hissəsinin təşəbbüsü ilə çağırılır.

6.3. Birliyinə təsisçilərinə və üzvlərinə Yığıncağın yeri və vaxtı haqqında iki həftə əvvəl məlumat verilməlidir.

6.4. Ümumi Yığıncağın səlahiyyətinə aşağıdakılar aiddir:

* Birliyin Nizamnaməsinin qəbulu və ona dəyişikliklər edilməsi;

* Birliyinə əmlakının formalaşması və istifadə prinsiplərinin müəyyən edilməsi;

* Birliyin icra orqanlarının yaradılması və onların səlahiyyətlərinin vaxtından əvvəl dayandırılması;

* illik hesabatın təsdiq edilməsi;

* başqa təşkilatlarda iştirak;

* Birliyin yenidən təşkili və ləğv edilməsi;

* Birliyin icra orqanının rəhbərlərinin hesabatının dinlənilməsi.

6.5. Ümumi Yığıncaq yalnız Birlik üzvlərinin yarısından çoxu iştirak etdikdə səlahiyyətli hesab olunur.

6.6. Ümumi Yığıncaqda müzakirə olunan məsələlər haqqında qərarlar sadə səsçoxluğu ilə qəbul edilir. Hər bir üzv bir səsə malikdir. Nizamnaməyə əlavə və dəyişikliklərin edilməsi və təşkilatın ləğvi barədə qərarın qəbulu üçün 2/3 səsçoxluğu tələb olunur.

6.7. Birliyin fəaliyyətinə cari rəhbərliyi icra orqanı həyata keçirir.

6.8. İcra orqanı Birliyin Sədrindən, onun müavinlərindən və digər şəxslərdən ibarət olan İdarə Heyətidir.

6.9. İdarə Heyəti kollegial icra orqanı olub aşağıdakı səlahiyyətlərə malikdir:

* Birliyin üzvlüyünə qəbul edir və üzvlükdən azad edir;

* təkliflər və layihələr irəli sürür;

* Birliyin filiallarını yaradır və nümayəndəliklərini açır;

* Birliyin başqa idarəetmə orqanlarının müstəsna səlahiyyətlərinə aid edilməyən bütün məsələləri həll edir.

6.10. İdarə Heyəti üzvlərinin yarısından çox iştirak etdikdə səlahiyyətli sayılır və qərarları sadə səsçoxluğu ilə qəbul edilir.

6.11. İdarə Heyətinin sədri, müavinləri və digər üzvləri Birliyin Ümumi Yığıncağı tərəfindən 2 (iki) il müddətinə seçilir.

6.12. Sədr:

* Birliyi təmsil edir, onun adından müqavilələr bağlayır, etibarnamələr verir, Ümumi Yığıncağın və İdarə Heyətinin qərarlarının icrasını təşkil edir;

* Ümumi Yığıncaq tərəfindən və Nizamnamə ilə onun üzərinə qoyulan digər funksiyaları həyata keçirir.

6.13. Birliyin Nzarət-təftiş komissiyası birliyin vəzifəli şəxslərinin

və üzvlərinin fəaliyyətinin Nizamnaməyə uyğun olması, habelə Birliyin maliyyə fəaliyyəti üzərində nəzarəti həyata keçirir. NTK üzvlərinin sayı Ümumi Yığıncaq tərəfindən müəyyən edilir. NTK-nın səlahiyyət müddəti 2 (iki) ildir.

NTK-nın qərarları sadə səs çoxluğu ilə qəbul edilir.

6.14. NTK Birliyin orqanlarından və üzvlərindən daxil olan müraciətlərə bir ay müddətində baxıb cavab verməlidir.

## VII. BİRLİYİN FƏALİJJƏTİNƏ XİTAM VERİLMƏSİ

7.1. Birliyin fəaliyyətinə onun yenidən təşkil edilməsi (birləşmə, qoşulma, bölünmə, ayrılma, çevrilmə) və ləğv edilməsi yolları ilə xitam verilir. Birliyin fəaliyyətinə xitam verilməsi mövcud qanunvericilikdə nəzərdə tutulmuş qaydada həyata keçirilir.

7.2. Birliyin fəaliyyətinə xitam verilməsi haqqında qərara əsasən ləğvetmə komissiyası yaradılır. Bu andan Birliyin idarəçiliyi ilə əlaqədar bütün səlahiyyətlər ona keçir. Ləğvetmə komissiyası ləğvetmə balansını tərtib edir. Birliyin ləğvi zamanı büdcə ilə hesablaşmalardan və kreditorların tələbləri ödənildikdən sonra qalan əmlak qanunvericiliklə müəyyən olunmuş qaydada Nizamnamə məqsədlərinə, bu mümkün olmadıqda isə dövlət büdcəsinə yönəldilir. Birliyin ləğvi Azərbaycan Respublikasının Mülki Məcəlləsinə və digər qanunvericilik aktlarına əsasən həyata keçirilir.

## VIII. DİGƏR ŞƏRTLƏR

8.1. Bu Nizamnamədə nəzərdə tutulmayan məsələlər qanunvericiliklə tənzimlənir.

8.2. Gələcəkdə bu Nizamnamənin müddəaları qanunvericiliklə ziddiyyət təşkil edərsə, qanunvericiliyin müddəaları tətbiq edilir.

8.3. Birliyin maliyyə ili dövlət qeydiyyatına alındığı tarixdən həmin ilin dekabr ayının 31-dək, növbəti ildən isə yanvar ayının 1-dən dekabrın 31-dək olan dövrü əhatə edir.

